**UOT: 631-47**

# SAMUR-YALAMA MILLI PARKININ OT BİTKİLƏRİNİN NÖV TƏRKİBİ VƏ FİTOKÜTLƏSİ

**H.M. ABDULLAYEVA**
**Bakı Dövlət Universiteti**

*Məqalədə Samur-Yalama Milli parkı torpaqlarının ot bitkiləri müqayisəli olaraq növ tərkibi müəyyən edilmişdir. Tədqiq edilən torpaqlarda ot bitkilərinin yerüstü nəm kütləsi və qurudulduqdan sonra quru kütləsi ölçülmüşdür.*

***Açar sözlər:*** *torpaq, fitokütlə, növ, biotop*

Milli parklar- xüsusi ekoloji , tarixi, estetik və digər əhəmiyyət daşıyan təbiət komplekslərinin yerləşdiyi və təbiəti mühafizə, maarifçilik, elmi, mədəni və digər məqsədlər üçün istifadə olunan ərazilərdir. Ölkəmizdə 9 milli park vardır, bunlardan biri yeni yaradılmış Samur-Yalama Milli parkıdır.

Samur-Yalama Milli parkı Xaçmaz rayonu inzibati ərazisində Azərbaycan Respublikasının Prezidentinin 2012-ci il 5 noyabr tarixli sərəncamı ilə yaradılmışdır.Milli Parkın yaradılmasında məqsəd Samur-Yalama ərazisində ekosistemlərin biomüxtəlifliyinin mühafizəsindən ibarətdir.

Samur-Yalama Milli parkı Samur-Dəvəçi ovalığının bir hissəsini təşkil edib və nazik bir zolaq şəklində dəniz sahili boyu uzanaraq 11772.45 hektar ərazini əhatə edir. Milli parkın əsasını meşə və düzən landşaftlar təşkil edir. Bu ərazi bir sıra təbii resurslara malik olan qiymətli iqlim kurortudur. Samur-Yalama Milli parkında meşə ekosistemləri üstünlük təşki edir. Meşə senozları dəniz boyu dar zolaq şəklində uzanaraq dəniz səthindən 400 m yüksəkliyə qədər qalxır. Ərazinin ekomühiti, əsasən, yağıntıları bərabər paylanan mülayim-isti iqlimə aiddir. Burada yay isti, payız uzunmüdətli isti, qış və yay isə mülayim, sərin keçir.

Bitki örtüyü biosferin üzvi maddə yaratmaq qabiliyyəti olan yeganə komponenti sayılır, yəni yer kürəsində məskunlaşan bütün canlıların, o cümlədən insanın həyatını təmin edən faktiki başlıca mənbədir. Meşə təbiətin orijinal və təkrarolunmaz hissəsidir və olduğu mühitə aktiv təsir etmə qabiliyyətinə malikdir. Meşədə ilbəil arası kəsilmədən ağac və kolların külli miqdarda yarpaqları, xırda və iri budaqları, qabıq, çiçək və meyvələri tökülür, onlara isə milyonlarla torpaq biotasının qalıqları qarışır. Torpaq səthinə düşən bu töküntülər tədricən parçalanır və humusəmələgəlmə prosesinə daxil olur. [1]

Milli parkın yerləşdiyi Samur-Dəvəçi ovalığının ərazisi vaxtilə düzən meşələri ilə əhatə olunmuşdur. Regionda kənd təsərrüfatının ( əkinçiliyin, bağçılığın, tərəvəzçılıyin) intensiz inkişafı ilə əlaqədar olaraq meşə örtüyü geniş ərazilərdə məhv edilmiş, onların yerində aqrosenozlar, seliteb-bağ, seliteb-rekreasiya-meşə landşaftları yaradılmışdır. Ovalıqda az-çox ilkin vəziyyətini saxlamış meşə örtüyü yalnız Samur-Yalama Milli Parkının yaradılması nəzərdə tutulan dəniz kənarı ərazidə dar zolaq şəklində qalmışdır.

**Tədqiqat obyekti və metodika.** Tədqiqatlarımız Samur-Yalama Milli Parkının şabalıdı və dağ çəmən torpaqlarında aparılmışdır. Həmin torpaqlarda təbii meşə biotopları seçilmişdir. Seçilmiş biotoplarda ot bitkilərinin növ tərkibi müəyyən edilmişdir. Təbii biotoplarda bitkilərin yerüstü fitokütləsi ölçülmüşdür. Metodika olaraq Быстрицкая Т.Л., Осычнюк В.В "Почвы и первичная биологическая продуктивность степей приазовья" kitabında istifadə edilib.

**Alınmış nəticələrin təhlili.** Apardığımız tədqiqatlar nəticəsində müşahidə etdik ki, Samur-Yalama Milli parkının ekosistemində əsas ağac növləri uzunsaplaq palıd və İberiya palıdıdır. Burada palıd meşələri ümumi meşə ilə örtülü ərazinin üçdə ikisini təşkil edir. Sahəsinin böyüklüyünə görə ikinci yeri vələs meşələri tutur. Bu meşələr əsasən törəmə tipli olub palıd meşələrinin yerində əmələ gəlmişdir. Relyefin çökək rütubətli yerlərində ağyarpaq qovaq meşələri, xırda çaylar boyu isə dar zolaq şəklində qızılağac və söyüd meşələri bitir, burada ağcaqayın növlərinə də rast gəlinir.

Milli parkın meşələrinin əsas ağacları palıd növləri (*Quercus sp.),* Qafqaz vələsi *(Carpinus caucasica)* və ağyarpaq qovaqdan *(Populus hybrida)* ibarətdir. Əsas meşə tipləri cavan palıd, lianlı palıd-qarağac, palıd-vələs, müxəlifotlu palıd və vələs meşəliyindən ibarətdir. Ağyarpaq qovaq üstünlük təşkil etdiyi meşələr əsasən aşağı doluluqlu olub yaşı ötmüş ağaclardan ibarətdir. Burada ağaclığın tərkibini diametri 1,0-1,5 m-ə çatan sarmaşıqlara sarılmış qovaqlar təşkil edir. Meşəaltı sıx yemişan, böyürtkən kolları keçilməz cəngəllik yaradır. Milli parkda 17 ağac abidə qeydə alınmışdır. Uzunömürlü

və çox yaşlı ağacların əksəriyyəti çinar *(Platanus L)* ağaclarından ibarətdir. [2]

Süni meşə əkinlərində adi qoz *(Yuglans regia)*, şərq alması *(Malus orientalis)*, ağ tut *(Morus alba)*, dəmirağac *(Parrotia persica)*, şabalıdyarpaq palıd *(Querces Castaneifolia)*, ağ akasiya *(Robinia)*, adi şabalıd *(Castanea safiva)*, şam *(Pinus sp)* və başqa ağac növlərindən istifadə olunmuşdur.

Meşə ərazilərində dövrü olaraq yarpaq yeyen zərərvericilərin kütləvi surətdə artması, həmçinin ayrı-ayrı ağac cinslərinin xəstəliklərə məruz qalması müşahidə olunur. Zərərvericilər kütləvi artdıqda palıd meşələrinə böyük ziyan vurur, onlar ağacların çətirlərinin çılpaqlaşmasına qədər yeyirlər.

**Cədvəl 1.**
**Samur-Yalama Milli Parkında olan ağac bitkilərinin növ tərkibi**

| **Scientific name** | **Azerbaijani name** | **English name** |
|---|---|---|
| **Tree species** | | |
| *Acer campestris* | Çöl ağcaqayını | Maple |
| *Alnus glutinosa subsp. barbata* | Saqqallı qızılağac | Black (Common) alder |
| *Alnus subcordata* | | Caucasian alder |
| *Betula sp.* | | Birch |
| *Carpinus caucasica* | Qafqaz vələsi | Caucasian hornbeam |
| *Fagus orientalis* | Şərq fıstığı | Oriental beech |
| *Fraxinus excelsior* | Adi göyrüş | Common ash |
| *Populus alba (P. alba subsp. nivea;* Syn.: *P. alba var pseudonivea* Grossh.) | Qovaq | White poplar |
| *Populus hybridus* | Ağyarpaq (hibrid) qovaq | Hybrid poplar |
| *Populus. nigra* | Qara qovaq | Black poplar |
| *Pterocarya fraxinifolia* (Syn.: *Juglans fraxinifolia* Lam.; *Pterocarya caucasica* C.A.Mey.; *Pterocarya pterocarpa* Michx.) | Qanadmeyvə yalanqoz | Caucasian wingnut or Caucasian walnut |
| *Quercus erucifolia* | Kövrək palıd | Tender oak |
| *Q. iberica* | İberiya palıdı | Iberian oak |
| *Quercus*[3] *longipes* (synonym for: *Q. robur* L. subsp. *pedunculiflora* K. Koch Menitsky | Uzunsaplaq palıd | Long stem oak |
| *Q. pubescens* subsp. *crispata* | Qumral palıdı | Oak |
| *Salix australis* | Cənub söyüdü | South willow Osier |
| *Ulmus foliacea (Syn.: Ulmus minor)* | Sıxyarpaq qarağac | Little elm (Syn.: Field elm) |

Samur-Yalama Milli parkı ərazisində ağaclarla yanaşı müxtəlif ot və kol bitkilərdə yayılmışdır. Ərazinin seyrək hissələrində zirinc *(Berberis sp)*, qaratikan *(Paliurus spina-christi)*, itburnu (*Rosa sp.)* , əzgil *(Mespilus germanica)*, yemişan *(Crataegus sp.)* kimi tikanlı kolcuqlar geniş yayılmışdır. Yuxarı yarusa çatan lianlar buradakı landşafta xüsusi gözəllik verir. Ərazi lianlarla zəngindir. Burada endem lian olan gitarayarpaq smilaks *(Smilax panduriformes)* müşahidə edilmişdir. Meşənin dərinliklərində sıx cəngəlliklər mövcuddur. Burada fıstıq fəsiləsi ilə yanaşı Ulmaceae *(Ulmus minor)* və Saliceae *(Salix sp., Populus hybrida)* fəsilələrinə aid növlərə rast gəlinir. Ərazi birillik və çoxillik ot bitkiləri ilə də çox zəngindir. Meşə arailərinin əsas hidrofil bitkiləri *Callitrichaceae, Hydrocharitaceae, Marsileaceae, Salvinacea* fəsilələrinə aiddir.

Dərman bitkilərindən dazı *(Hypericum)*, andız *(İnula)*, yemişan *(Crategus)*, qaraqınıq *(Origanum mayorana)*, itburnu növləri *(Rosa sp)*, böyürtkən növləri *(Rubus sp)*, gəndəlaş *(Sambucus)*, gicitkan *(Urtica)*, çaytikanı *(Hippophae*), murdarça *(Francula alnus)*, subibəri *(Polygonum hidropiper)* və bir çox başqalarına rast gəlinir. [4]

**Cədvəl 2.**
**Samur-Yalama Milli Parkında kol bitkilərinin növ tərkibi**

| Scientific name | Azerbaijani name | English name |
|---|---|---|
| *Ephedra sp.* | | Indian tea |
| *Euphorbia sp.* | Südləyən | Spurge |
| *Festuca gigantea* | Topal | Festue |
| *Galanthus caucasicus* | Novruzgülü | Daffodil |
| *Galium sp.* | Dilqanadan | Bedstraw |
| *Geranium sp.* | Ətirşah | Cranes-bill |
| *Hordeum spontaneum* | Yabanı arpa | Wild barley |
| *Hupericum perferatum* | Dazıotu | St. John's wort |
| *Hypercium perforatum* | Dazıotu | St. John's wort |
| *Inula caspia* Blum | Xəzər andızı | Elecampane |
| *Inula helenium* | | Elecampane |
| *Juncus acutus* | Cığ | Rush |
| *Medicago sp.* | Yonca növləri | Alfalfa |
| *Mentha sp.* | Su nanəsi | Mint |
| *Nelumbi nicifera* | Şanagüllə | Lotus |
| *Origanum mayorana* | Qaraqınıq | Sweet marjoram |
| *Phragmites australis* | Qamış | Reed |
| *Plantago major* | Iri bağayarpağı | Plantain |
| *Poa nemoralis* | Qırtıc | Meadow-grass |

Samur-Yalama Milli parkında apardığımız müşahidələr nəticəsində ərazidə yayılmış ot növləri müəyyən edilmişdir. $1m^2$ ərazidən götürülmüş ot bitkilərinin yerüstü kütləsinin nəm çəkisi ölçülmüşdür. Laboratoriya şəraitində nəm kütlə qurudulduqdan sonra onların quru çəkisi müəyyən edilmişdir. Alınmış nəticələr müqayisəli olaraq təhlil edildi.




Təbii senozun ot bitkiləri formasiyalarının inkişaf mərhələləri

**Diaqram 1.** İnkişaf mərhələsindən asılı olaraq ot bitkilərinin nəm və quru fitokütləsi

**Nəticələr.**

1. Apardığımız tədqiqatlar nəticəsində Samur-Yalama Milli parkında 17 növ ağac, 20 növ kol bitkisi müşahidə etdik.

2. Yerüstü fitokütlənin miqdarı nəm halda 623-1125 qr/$m^2$ olduğu halda, quru çəkisinin 230-346 qr/$m^2$ aralığındadır.

**ƏDƏBİYYAT**

1. Məmmədov Q.Ş, Xəlilov M. Ekologiya, ətraf mühit və insan. "Elm" 2006.608 s. 2.БыстрицкаяТ.Л.,Осычнюк В. .В Почвы и первичная биологическая продуктивность степей приазовья . Москва 1975 «Наука» 109 с. 3. Гроссгейм А.А. Растительные ресурсы Кавказа 1946 Баку: Изд. Азерб. ССР. 671 с. 4. R.M.Məmmədov. Landşaft planlaşdırılması: Mahiyyəti və tətbiqi Bakı-2016

**Видовой состав и фитомасса травянистой раститеньности**
**Самур Яламанского Национального Парка**

**Х.М.Абдуллаева**

Исследований провадилисы на территории Национального Самур Яламанского парка расположенный на северо востоцной склоне Больышого Кавказа. Целью наших исследований было установление видового состава травянистой и кустарнивикой растителности находяшейся на разлицной стадии развития.

На выбранных естественных биотопах сравнителна уцитывалась срая и воздушна сухая фитомасса травинистеой растителности.

***Ключевые слова:*** биота почва, вид, фитомасса

**Species composition and phytomass of grass plants in the**
**Samur-Yalama National Park**

**H.M.Abdullayeva**

The Samur-Yalama National Park, located on the north-eastern slope of the Greater Caucasus, has been researched. Various types of grass and shrubs have been selected . In natural biotopes, relative humidity and dry phytokytes of grasses have been compared comparatively

***Key words:*** biota, the soil, species, phytomass

**humi.abdullayeva@gmail.com**